# Sələf əqidəsinin üsullarına əsasən "İman" və "Küfr" elmi məsələlərinin icmalı

**Müəlliflər:**

- Muhəmməd ibn Musa Ali Nasr
- Hüseyn ibn Audə əl-Avayişəh
- Əli ibn Həsən əl-Hələbi əl-Əsəri
- Basim ibn Feysal əl-Cəuhəri
- Səlim ibn İdul-Hiləli
- Məşhur ibn Həsən Ali Salman

**İmam Albani adına elmi araşdırmalar mərkəzi**

**Rəhimli və Mərhəmətli Allahın adı ilə**

Bu kitabı oxuyub razılıqlarını bildirən alimlərdən bəziləri aşağıdakılardır:

- Şeyx Əli əl-Husayyin
- Professor Rabi ibn Hadi əl-Mədxali
- Şeyx Əli ibn Həməd əl-Xaşşən
- Şeyx Doktor Hüseyn Ali Şeyx
- Şeyx Əhməd ibn Yəhya ən-Nəcmi
- Şeyx Doktor Muhəmməd əl-Məğravi
- Şeyx Doktor Vasiyyullah Abbas
- Şeyx Doktor Muhəmməd ibn Ömər Bəzmul
- Şeyx Doktor Xalid əl-Ənbəri
- Şeyx Usamə ibn Abdullətif əl-Qausi
- Şeyx Əbul Həsən əl-Maribi
- Şeyx Muhəmməd ibn Hadi əl-Mədxali
- Şeyx Abdussələm ibn Bərcis Ali Abdulkərim
- Şeyx Hüseyn Aşiş
- Şeyx Mahmud Atiyyə

Allah onların hər birini qorusun

Uca Allah Qurani Kərimdə buyurur:

**“Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizlərdən kim onları (özünə) dost tutarsa, o da onlardandır. Allah zalım adamları doğru yola yönəltməz. Sən qəlbində xəstəlik olanların: “Qorxuruq ki, başımıza bir fəlakət gələ”– deyərək onların (Kitab əhli) arasında vurnuxduqlarını görürsən. Ola bilsin ki, Allah qələbə (bəxş etsin) və ya dərgahından bir əmr versin və onlar ürəklərində gizlətdiklərindən peşman olsunlar. İman gətirənlər isə deyəcəklər: “Sizinlə bərabər olacaqlarına dair Allahın adı ilə möhkəm and içənlər bunlardırmı?” Onların əməlləri puça çıxdı, özləri də ziyana uğrayanlardan oldular. Ey iman gətirənlər! Sizlərdən hər kim dinindən dönsə, Allah (onun əvəzinə) Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah (hər şeyi) Əhatəedəndir, Biləndir. Sizin himayədarınız yalnız Allah, Onun Elçisi və iman gətirənlərdir. Onlar (Allaha) boyun əyərək namaz qılır və zəkat verirlər. Kim Allahı, Onun Elçisini və iman gətirənləri (özünə )dost tutarsa, (bilsin ki,) qələbə çalanlar da məhz Allahın firqəsidir. Ey iman gətirənlər! Sizdən əvvəl Kitab verilənlərdən dininizi ələ salıb oyun-oyuncaq**

**hesab edənləri və kafirləri (özünüzə) dost tutmayın. Əgər möminsinizsə, Allahdan qorxun"** ( əl-Maidə surəsi, 51-57).

## Müqəddimə

Allaha layiqincə həmd, Onun qulu və elçisi Məhəmmədə, onun ailəsinə, səhabələrinə və ardıcıllarına salavat və salam olsun. Allaha həmd olsun ki, bu risalə həm əvvəllər, həm də bu günkü gündə insanların düşüncə tərzlərinin bir-biri ilə çəkişdiyi, anlama səviyyələrinin bir-biri ilə hər yerdə çarpışdığı məsələlərdə sələfin yəni Əhli sünnə val-camaanın mövqeyini özündə əhatə etdiyi üçün ilk dəfə nəşr olunarkən elm tələbələri tərəfindən böyük coşqu ilə qarşılanmışdı.

Allaha həmd olsun ki, yığcam olmasına rəğmən bu risalə Allahın hidayət verib doğru yola yönəltdiyi və zəlalətə aparan nəfsi istəklərə uymaqdan və yanlış rəylərdən uzaqlaşdırdığı kəslər üçün qəlblərə əlac, canlara şəfa, habelə vəhdətin və birliyin qapısı olmuşdur.

Bir çox elm tələbələri bu risalə barəsində sevinc və fərəh hislərini bildirərək bizə öz rəy və fikirlərini yazıb göndərmişlər. Onlardan biri yazır: “Sizin “İman və küfr məsələləri” adlı risalənizi oxuduqdan sonra onun çox faydalı, elmi əsasları olan bir risalə olduğunun şahidi oldum. Bu risalə özü-özlüyündə fitnə-fəsadların yayıldığı bir vaxtda, habelə peyğəmbərə tabeçiliyin zəiflədiyi bir zamanda şəriətin mövqeyinin sabitliyini əks etdirir. Bu da müəlliflərin ülvi məqamlarının göstəricisidir. Çünki bu risalə nicata çatan firqənin, yardım olunmuş tayfanın böyük dəvətçiləri tə-

rəfindən yazılmışdır. Allah onları xeyirlə mükafatlandırsın və onları bidət və zəlalət əhli üçün göz dağı etsin.”

Bu da aşağıdakı şəri və dünyavi olan bir qaydanı təkidləyir: “Sonda yalnız düzgünlük bərqərar olur”.

Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun.

Son sözümüz aləmlərin rəbbi olan Allaha həmd olsundur.

**İordaniya Krallığı/Amman şəhəri.**
**Zilqidə ayının ortaları/1422-ci il.**

## Birinci nəşrin müqəddiməsi

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi də azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"**[1]

**"Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir".**[2]

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar".**[3]

---

[1] Ali İmran, 102.

[2] ən-Nisa, 1.

[3] əl-Əhzab, 69-70.

Şübhəsiz ki, kəlamların ən xeyirlisi Allah kəlamıdır, yolların ən xeyirlisi isə Muhəmmədin ﷺ yoludur. Ən pis əməllər yeniliklərdir, hər bir yenilik bidət, hər bir bidət zəlalət, hər bir zəlalət isə oddadır.

Bu kitab iman və küfr məsələləri və onlarla əlaqəli olan digər məsələlərlə bağlı Sünnə etiqadını əhatə edən müxtəsər elmi əsərdir. Günümüzdə bu barədə danışanlar, bu məsələlərə girişib onlar barəsində mübahisə edənlər çoxalıb. Hətta bəzən bu mübahisələr bəzilərinin bir-birinə tənə etmələrinə və aralarında ziddiyyətlərin yaranmasına səbəb olmuşdur.

Bu səbəbdən biz, qorunmaqda olan Şamdakı[1] elm tələbələri müsəlmanların birliyinə, camaatın xeyrinə, haqqı bəyan etməyə, düzgünlüyü aydınlaşdırmağa, haqqı axtaranların hidayətə çatmaları və yalançıların susdurulması üçün Əhli Sünnə vəl-cəmaanın qaydalarına və hədis əhlinin, sələflərin üsullarına əsasən bu məsələləri müxtəsər və əsaslı şəkildə elmi kitabda toplayıb yazmağı qərara aldıq.

Bu müxtəsər risaləni yazdıqdan sonra onu bir çox elm əhlinə və elm tələbələrinə, İslam aləmində Allahın yoluna dəvət edən ən xeyirli hesab etdiyimiz şəxslərə göstərdik. Əsas məqsədimiz onların mülahizə və təkliflərindən faydalanmaq idi. Allahın izni ilə onlar risaləni oxuyub təsdiqləyərək bizə bəzi təkliflər

---

[1] Şeyxul İslam İbn Teymiyyə demişdir:"Şam əhli Murciələrə qarşı çox sərt olmuşlar." Fətvalar məcmusu (7/432)

verdilər. Uca Allahdan onları xeyirlə mükafatlandırmasını diləyirik.

Sonra daha çox rahat və mütməin olmaq üçün belə bir qərara gəldik ki, onu iki Müqəddəs Həram diyarının muftisi, Böyük Alimlər Heyətinin və Elmi araşdırmalar və fətvalar idarəsinin rəhbəri möhtərəm şeyx Abdüləziz ibn Abdullah Ali Şeyxə - Allah onu hifz etsin – göstərək.

Səudiyyə Ərəbistanı Krallığının İordaniyadakı dini nümayəndəsi möhtərəm şeyx Səd əl-Husayyininköməkliyi ilə bu müxtəsər işi diplomatik poçt vasitəsilə ona göndərdik.[1]

Bundan sonra qardaşımız şeyx Əli ibn Həsən ibn Əli ibn Abdulhəmid əl-Hələbi əl-Əsəri iki Müqəddəs Həramın yerləşdiyi ölkəyə etdiyi səfər zamanı[2] möhtərəm şeyx Abdüləziz ibn Abdullah Ali Şeyxlə onun mənzilində görüşdüyündə, ondan kitab haqqında soruşarkən, şeyx kitabın ona çatmadığını bildirmişdi.

Allahın izni ilə bizə bu elmi kitabı yaymaq vacib oldu ki, hər kəs otuz ildən bəri bizim böyük, görkəmli, əziz və möhtərəm şeyxlərimiz Əbu Abdur Rahman Muhəmməd Nasirəddin əl-Albani, Əbu Abdullah Abdüləziz ibn Bəzz, Əbu Abdullah Muhəmməd Saleh əl-Useymin (Allah onlara rəhmət eləsin), habelə onlar

[1] 29.05.1421-ci il tarixdə.
[2] 12.07.1421-ci il tarixdə.

kimi etiqadda, mənhəcdə, elm və əməldə, anlayış və təsəvvürdə olanlardan öyrəndiyimiz səhih sünnə əqidəsi və açıq-aydın sələf mənhəcində olduğumuzu bilsin.

Qeyd etdiyimiz bu böyük məsələlərin şərhi, onların dəlillərinin xatırlanması və onların sələfin sözləri ilə əsaslandırılmasına gəlincə fikrimizcə hal-hazırda bunun yeri deyil. Hərçənd ki, bunun daha çox açıqlanmasına ehtiyac var, lakin bunun üçün ayrıca kitablar yazılmalıdır.

Uca Allahdan bizim bu kiçik əməyimizi qəbul etməsini diləyirik.

Şübhəsiz ki, müvəffəqiyyət Allahdandır.

**Möhtərəm şeyx Abduləziz ibn Abdullah Ali Şeyxə (Allah onu hifz etsin) ünvanlanmış məktubun mətni:**

**Rəhimli və mərhəmətli Allahın adı ilə.**

Həmd Allaha məxsusdur, Allahın rəsuluna, onun ailəsinə, səhabələrinə və onların ardıcıllarına salavat və salam olsun.

Hörmətli şeyx: Abduləziz ibn Abdullah Ali Şeyx (Allah elminizlə bizlərə fayda versin ):

Əssəlamu aleykum va rahmatullahi va bərakətuh.

Biz sələfi salehin qaydalarına əsasən haqqa və onun əhlinə həris olaraq iman məsələlərinin bəyan olunması və aydınlaşdırılması barəsində yazdığımız bu müxtəsər risaləni sizə göndəririk ki, bizə öz rəy və təkliflərinizi, faydalarınızı bildirəsiniz. Biz sizin rəy və mülahizələrinizi gözləyirik.

Uca Allahdan həm bizə, həm də sizə müvəffəqiyyət, dürüstlük və hidayət diləyirik.

Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və bütün səhabələrinə salam olsun.

Sonda isə Aləmlərin rəbbi olan Allaha həmd olsun.

**Məktubu yazanlar:**

- **Muhəmməd ibn Musa Ali Nasr**
- **Hüseyn ibn Audə əl-Avayişəh**
- **Əli ibn Həsən əl-Hələbi əl-Əsəri**
- **Basim ibn Feysal əl-Cəuhəri**
- **Səlim ibn İdul-Hiləli**
- **Məşhur ibn Həsən Ali Salman**

**Cəmədul ulə ayının 28-i 1421-ci il.**

# Sələf əqidəsinin üsullarına əsasən "İman" və "Küfr" elmi məsələlərinin icmalı

**1 . İman.**
**2 . Küfr və təkfir.**
**3 . Namazı tərk edənin hökmü.**
**4 . Allahın hökmü ilə hökm vermək.**
**5 . Dost və düşmən anlayışı.**
**6 . Murciələr.**
**7 . Xəvariclər.**
**8 . Allah yolunda cihad etmək.**

# 1. İman

1. İman[1]: Qəlblə etiqad etmək, dillə demək və bədən üzvləri ilə əməl etməkdir. Bunların hər üçünün olması labüddür.

[1] İmanın tərifi: İmam Əbul-Huseyn Əli ibn Xələf ibn Bəttal əl-Maliki əl-Məğribi "Səhih əl-Buxari"ni şərh edərkən demişdir: "Sələflərdən və xələflərdən (keçmiş və indiki nəsildən) olan əhli-sünnə alimləri ittifaq etmişlər ki, iman həm sözdür, həm də əməldir, həm artır, həm də azalır. İmanın artıb-azalmasına sübut isə Buxarinin ("Səhih" əsərində) dəlil gətirdiyi ayələrdir: **"Möminlərin imanı üstünə iman artırmaq üçün onların qəlbinə rahatlıq göndərən Odur"** (əl-Fəth, 4); **"Onlar Rəbbinə iman gətirmiş gənclər idi. Biz də onların hidayətini artırdıq"** (əl-Kəhf, 13); **"Allah doğru yolda olanların hidayətini artırar"** (Məryəm, 76); **"Doğru yolla gedənlərə gəldikdə isə, *Allah* onlara hidayətini artırar və onları təqvalı olmağa müvəffəq edər"** (Muhəmməd, 17); **"...iman gətirənlərin imanı artsın"** (əl-Muddəssir, 31); **"İman gətirənlərə gəldikdə isə, *o surə* onların imanını artırır"** (ət-Tovbə, 124); **"*Bəzi* adamlar** (möminlərə)**: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı..."** (Ali-İmran, 173); **"Bu, onların yalnız imanını və itaətini artırdı"** (əl-Əhzab, 22) Nəvəvi, 1/103.

İbn Həcər "Fəth əl-Bari" əsərində iman kəlməsini belə izah etmişdir: "Sələflər demişlər: "İman, qəlb ilə təsdiq etmək, dil ilə tələffüz etmək və bədən əzaları ilə əməl etmək deməkdir". (Yəni "Lə ilahə illəllah, Muhəmmədun Rəsulullah" deyən adam, bunu təkcə dili ilə deyil, qəlbi ilə də Allahdan başqa ibadətə layiq məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna etiqad etməli, Allahın və Onun rəsulunun buyuruqlarını yerinə yetirməli və qadağan etdikləri əməllərdən çəkinməlidir.) Sələflər demək istəmişlər ki, əməllər imanın kamil olması üçün şərtdir. Elə buradan da imanın artıb-azalması məsələsi ortaya çıxmışdır" 1/46

İman və İslam[1] şəriətin iki əsas hökmüdür. Yanaşı qeyd olunduqda müxtəlif mənalarda, ayrı-ayrı yerlərdə işnəldikdə isə eyni məna və hökmü ifadə edirlər.

Bu qaydaya əsasən də imandan çıxmaq qətiyyən islamdan çıxmaq anlamında deyildir.[2]

2. Bütün əməllər - istər qəlbi əməllər, istərsə də bədən üzvləri ilə yerinə yetirilən əməllər - imandandır və onun vaciblərindəndir.

Biz həmin əməllərdən ən kiçiciyini belə imandan kənar hesab etmirik. Belə olduğu halda ən böyük əməli necə çıxara bilərik?!

3. "İman qəlblə təsdiq etməkdən ibarətdır" və ya "iman qəlblə təsdiq etmək və dillə söyləməkdən ibarətdir" ifadələri ilə kifayətlənərək bədən üzvləri ilə əməl etməyi qeyd etməmək əhli sünnəyə məxsus rəy deyildir.

---

[1] İslam: lüğəti mənada ram olmaq, boyun əymək, itaət etməkdir, istilahi mənada isə, Allahın tək məbud olduğunu qəbul etmək, Ona boyun əyərək itaət etmək, şirkdən uzaq olmaq və müşriklərə nifrət etmək deməkdir. Uca Allah buyurur: **"De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanların birincisiyəm"** (əl-Ənam, 162-163); **"İslamdan başqa bir din axtaran şəxsdən, o *din* heç vaxt qəbul olunmaz və o, axirətdə ziyana uğrayanlardan olar"** (Ali-İmran, 85). "Usulul-İman", 1/338.

[2] Şeyxul İslam ibn Teymiyyə "Fətvalar məcmusu" əsərində (7/357) demişdir: "Bir şəxsin müsəlman olması, onun mömin olması demək deyildir." Sonra da demişdir: "Şübhəsiz ki, imanın vaciblərini yerinə yetirməyən müsəlman, özünə qarşı zülm etmiş olur."

Bunu deyən kəs həm özü azğınlıqdadır, həm də beləsi başqalarını zəlalətə sürükləyir. Bu azğın murciələrin rəyidir.[1]

4. İman şöbələrdən və qisimlərdən ibarətdir. Onun elə qisimləri vardır ki, onları tərk etmək küfr, elə qismləri var ki, onları tərk etmək böyük və ya kiçik günah, elələri də var ki, onları tərk etmək sadəcə savabı və ya əcri əldən vermək hesab olunur.

5. İman itaətlər etməklə kamillik mərtəbəsinə çatanədək artır, habelə günah işlər görməklə zərrə qədər qalanadək azalır. Əgər həmin zərrə də yox olarsa iman da tamamilə əldən gedər.

6. Həm gizlində, həm də aşkarda imanla əməlin bir-biri ilə sıx bağlı olması barədə Şeyxul İslam ibn Teymiyyə "Fətvalar məcmusu" əsərində (7/644) demişdir: "İmanın əsası qəlbdə olur. Burada qəlbin deməsi və əməl etməsi nəzərdə tutulur. Başqa sözlə iman qəlbin təsdiq etməsi, sevməsi və itaət etməsidir.

Əgər qəlbdə imandan əsər-əlamət varsa gərək o özünü bədən üzvləri vasitəsi ilə büruzə versin. Çünki əməlin olmaması imanın olmamasına və ya onun zəifləməsinə dəlalət edir.

Beləliklə də zahirdəki əməllər qəlbdəki imanın vaciblərindəndir. Bu əməllər qəlbdəki imanın təzahürü, onun sübutudur, eyni zamanda mütləq iman anla-

---

[1] Həmçinin murciələrə müxalif olaraq sünnə əhli "dillə əməl etməkdir" demir.

yışının bir hissəsidir. Lakin bədən üzvləri ilə yerinə yetirilən əməllərin əsli qəlbdə olur."

Beləliklə Şeyxul İslam ibn Teymiyyənin bir çox yerlərdə qeyd etdiyi kimi mütləq yəni kamil imanın olmaması ümumiyyətlə imanın olmaması demək deyil. Amma ola bilsin ki, məlum mötəbər qaydalar çərçivəsində kamil imanın olmaması səbəbindən imanın əsli də olmasın.

7. Bədən üzvləri vasitəsi ilə icra olunan əməllərin hər biri özü-özlüyündə ya vacib imanın, ya da müstəhəb imanın kamilliyindən hesab olunur. Bunu da artıq biz Şeyxul İslamın sözünü nəql edərkən qeyd etmişik.[1]

8. "Əməl imanın kamilliyinin şərtidir" və ya "imanın səhihliyinin şərtidir" kimi ifadələrə gəlincə - baxmayaraq ki, günümüzdə bir çoxları bu məsələyə müdaxilə edirlər - nə Quranda, nə Sünnədə, nə də mübarək üç əsrin sələflərindən kiminsə bunu işlətməsi varid deyildir.

Bu baxımdan iman anlayışını bəyan etdiyimiz təfsilata uyğun olaraq işlətmək özü-özlüyündə məqbul hesab olunur.

Onu da xüsusi olaraq vurğulayırıq ki, burada şərt sözü ən yüksək dərəcəli vacib mənasını daşıyır. "Həmin şərt olarsa iman da olar" və ya "həmin şərt ol-

---

[1] Yalnız namaz istisnadır, çünki fiqhi hökm olaraq o bir rükndür. Onu tərk etmək isə küfrdür. Başqa bir rəyə görə digər dörd rükn: o cümlədən zəkat, oruc və həcc də namazla eyni hökmdədir.

mazsa iman da olmaz" mənasında deyildir. Çünki şərt kəlməsi bu anlayışın mahiyyəti xaricindədir!

Belə olduğu halda gərək biz bir çox istilahi sözləri sadəcə istilah olduqlarından dolayı rədd edək!

Lakin bu istilahı "müstəhəb imanın kamilliyi" mənasında anlamaq, əməli imandan xaric hesab etmək və ya "asi olanlar kamil iman sahibləridir"- demək, bütün bunlar batil ifadələrdir və zəlalətdən başqa bir şey deyildir.

"Əməlin cinsi"[1] və ya "Əhəd əməllər" istilahları da buna yaxın mənadadır.

Bütün bu tip ifadələr möhtərəm şeyx Muhəmməd ibn Saleh əl-Useyminin qeyd etdiyi kimi dəlil-sübutu olmayan boşboğazlıqdan başqa bir şey deyildir.

O, bunu ona görə demişdi ki, əvvəla bunları birbirindən ayırmağa heç kimin dəlili yoxdur. Digər tərəfdən bu mübahisə edənlərin və haqqı araşdıranların arasında müxtəlif ayrıseçkiliyin yaranmasına səbəb olur.

Bütün bu batil istilahlardan daha pisi "İman kamil deyilsə, demək yoxdur" – ifadəsidir.

Sonda da bildiririk ki, bütün bu yeni istilahlara və onları iman və küfrlə əlaqələndirmək üçün mötəbər hesab olunan şəri dəlillər lazımdır. Bu həm mübahisələrə son qoyar, həm də saxta və əsassız fikirləri aradan qaldırar.

---

[1] Bu istilahı inadkarcasına işlədənlər bunu sonda namazla bağlayırlar. Ona görə də diqqətli olun.

## 2. Küfr və təkfir.

1. Təkfir məsələsi müəyyən qaydaları olan şəriət hökmüdür. Onun əsl qaydaları Uca Allah və onun rəsulunun buyurduğu kimidir.

Təkfirin qaydalarını tərk etmək böyük təhlükə və fitnə, qorxulu bir şərdir.

2. Hər hansı bir kəsin müsəlman olması yəqinliklə sübuta yetirilmiş olarsa, həmin müsəlmanlığı onun üzərindən götürmək də yəqinliklə sübuta yetirilməlidir. Çünki ehtimalla təkfir olmur.

3. Quran və ya sünnədə küfr ilə vəsf olunan hər bir söz və ya əməl, sahibini İslam ümmətindən çıxaran böyük küfr mənasında işlənmir. Belə ki, küfrün iki növü vardır: Böyük küfr və kiçik küfr. Bu cür söz və ya əməllərə hökm vermək əhli Sünnə alimlərinin yoluna və əhkamlarına müvafiq olaraq verilir.

4. Quran, Sünnə və ümmətin açıq-aşkar və aydın şəkildə icma etdiyi əməllər[1] istisna olmaqla, hüccət qaldırılmadan heç bir şəxsə "kafir" hökmü vermək olmaz.

5. Ola bilsin ki, Quran və ya Sünnədə hər hansı bir sözün, əməlin və ya hansısa bir etiqadın küfr olduğuna dəlalət edən ayə və ya hədislər olsun. Bununla belə hüccət qaldırılmayınca və maneələr aradan götürülməyincə heç kəs müəyyən bir şəxs olaraq təkfir olun-

---

[1] Allahı və ya Onun rəsulunu təhqir etmək və ya Quranı natəmiz yerlərə atmaq kimi əməllər bura aiddir.

maz. Hüccətin qalxması üçün isə müəyyən şərtlər olmalıdır. Hansı ki, həmin şərtlərin olmayacağı təqdirdə bunların əksi olan maneələr meydana gəlir. Bu şərtlər də həmin şəxsin qeyd olunan məsələ barəsində elminin olması, bunu qəsdən[1] və öz ixtiyarı ilə etməsidir.

Bunu da həyata keçirənlər elm əhli, rəbbani alimlər və ya onların göstərdiyi şəriət qaydalarına və əhkamlarına müvafiq şəkildə hökm vermə yolu ilə tətbiq edib bağlayacaq şəxslər olmalıdır.

6. Küfrün iki növü vardır[2]: Böyük küfr, kiçik küfr.

7. Böyük küfr də müxtəlif növlərdən ibarətdir: inkar etmək, yalan saymaq, rədd etmək, şəkk etmək, nifaq, üz çevirmək, istehza etmək, halal görmək kimi əməllər. Bütün bunların böyük küfr olmasına Quran, səhih sünnə və Şeyxul İslam İbn Teymiyyə, onun tələbəsi İbn Qeyyim, habelə onlardan öncə və sonra yaşamış başqa sünnə alimlərinin dedikləri açıq şəkildə dəlalət edir.

Azlığından və ya çoxluğundan, yaxınlığından və ya uzaqlığından asılı olmayaraq hər bir müsəlmanın bu kimi əməlləri etməsi ehtimal olunduğu üçün bütün bunlardan həzər etmək və uzaqlaşmaq gərəkdir.

---

[1] Buradakı qəsd sözü küfrün qəsd olunması deyil, felin qəsd olunması mənasındadır.

[2] Bu iki növü bir-birindən ayırmaq və ya birinə aid etmək üçün Quran və Sünnədən dəlil, böyük sələf alimlərinin fəhmi və ya əhli sünnə alimlərinin dediklərinə qayıtmaq lazımdır.

8. Küfrün növləri olduğu kimi, onun həmin növlərə çatdıran səbəbləri də mövcuddur. Həmin səbəblər aşağıdakılardır:

- Söz.
- Əməl.
- Etiqad.

9. Əməllə və sözlə olunan küfrün hər biri iki növdür:

a) İslam ümmətindən çıxarmayan küfr: Allahdan başqasına and içmək və ya falçının yanına getmək kimi əməllər qətiyyətlə xalis əməli[1] küfr hüsab olunur.

b) Hər hansı bir bir əməli etməklə sahibini İslam ümmətindən çıxaran küfr. Bu kimi əməlləri edən kəsin təkfir olunması üçün onun həmin əməli qəlbdə halal görməsi şərt deyil. Çünki belə əməllər batini küfrün olmasına dəlalət edən zahiri küfr hesab olunur. İmanla ziddiyyət təşkil edən hər bir əməl bu növə aiddir. Uca Allahı söymək, Peyğəmbəri ﷺ təhqir etmək, bütə səcdə etmək və ya Qurani Kərimi çirkab yerlərə atmaq kimi əməllərin bu qismə aid olmasına həm dəlillər var, həm də alimlər buna hökm vermişdirlər.

Bu hökmün müəyyən şəxslərə tətbiq olunmasına gəlincə isə bu, mötəbər şərtlər və bunu tətbiq edən

---

[1] Əgər hər hansı bir əhli sünnə alimi "əməli küfrə görə insan təkfir olunmur" – deyərsə, şübhəsiz ki, onun məqsədi kiçik küfrdür. Eyni zamanda "etiqadi küfr" deyildikdə həmişə böyük küfr nəzərdə tutulur.

şəxslərin buna layiq olmaları çərçivəsində mümkündür. Yəni həmin şəxs bu əməli qəsdən və öz ixtiyarı ilə etməlidir.

10. Bizlər əhli Sünnənin söylədiyi kimi deyirik ki; Zahirən xalis küfr olan söz və ya əməl özü-özlüyündə sahibini İslam ümmətindən çıxaran küfrdür və bu əməl batindəki küfrə dəlildir.

Zəlalət əhli olan bidətçilərin dediyi kimi demirik ki, "əməli küfr küfrə dəlildir, lakin küfr deyil."

Bu iki rəyin arasında çox incə fərq var.

11. Bütün ibadətlər imanın şöbələri və dərəcələr olduğu kimi, bütün günahlar da öz növbəsində küfrün şöbələri və dərəcələridir.

12. Əhli Sünnə sadəcə böyük və ya kiçik günah etdiklərinə görə qiblə əhlindən olan asiləri təkfir etməzlər. Belə ki, onlar həmin əməli halal saymadıqları və ya başqa növ küfr etmədikləri müddətdə onların imanlarının naqis, yəqinlərinin zəif və dinlərinin yetərsiz olduğunu iqrar edərlər.

Böyük günah edənlərin imanlarının azalmadığını iddia etmək zəlalətdə və çaşqınlıqda olan Murciə məzhəbidir.

Əhli Sünnə isə bu cür asilərin əzaba məhkum edilmələrindən və onların Cəhənnəm oduna girə biləcəklərindən qorxurlar. Lakin onların Cəhənnəmdə əbədi qalacaqlarına hökm verməzlər. Çünki onların qəlbində tövhidin əsası olduğu üçün müəyyən müddət sonra olsa belə, şəfaət sahiblərinin şəfaəti və aləmlərin

Rəbbi olan Allahın rəhmi ilə Cəhənnəm odundan çıxacaqlarını söyləyərlər.

Böyük günahlara və buna bənzər əməllərə görə təkfir etmək isə azğın Xəvariclərin məzhəbidir.

13. Küfr olan bir əməli edən kəsi kafir və ya mürtəd adlandırılmaqdan qurtulmaq üçün cahillikdə üzürlü saymaq əhli sünnənin əsaslarındandır. Əhli sünnə də haqqı ən gözəl bilən və məxluqata qarşı ən mərhəmətli olanlardır. Bununla da küfr əməli edən hər bir şəxs kafir olmur.

Yalnız qaydaların müxtəlifliyi ilə zaman və məkana görə dəyişən, dində bilinməsi zəruri olan məsələlər istisnalıq təşkil edir. Çünki bu cür məsələləri alimlərlə cahillər eyni səviyyədə bilirlər.

Bütün bunları da müəyyənləşdirmək və hal-hazırkı vaxtda uyğunlaşdırmaq üçün böyük alimlərə və sünnə imamlarına müraciət olunmalıdır.

Bəli, şəkk yoxdur ki, bu üzr onu günahın məsuliyyətindən azad etmir. Beləsi elm tələb etmədiyi və haqqı araşdırmağa səy göstərmədiyi üçün günah qazanmış olur.

## 3. Namazı tərk edənin hökmü.

1. Namaz bədən üzvləri vasitəsilə icra olunan ən böyük və ən əzəmətli rüknüdür. O, dinin dirəyi, imanın göstəricisi və ən əsas əlamətidir.

2. Əhli sünnə alimləri arasında heç bir ixtilaf yoxdur ki, namazı inkar edən şəxs İslam ümmətindən çıxaraq kafir olur.

Eləcə də namaz qılmayacağı təqdirdə qılıncla öldürüləcəyi ilə xəbərdar olunduqdan sonra, namazı deyil ölümü tərcih edən şəxsin də zahirən bundan imtina etməsi, batində də imanın olmamasına dəlalət etdiyi üçün o, kafir və mürtəd hesab olunur.

3. Əhli sünnə və sələf mənhəcinə tabe olanların arasında ixtilaf namazı inkar etmədən tənbəllikdən tərk edən kəs barəsindədir.

Elm əhlindən imam Əbu Hənifə, imam Malik, imam Şafii və imam Əhməddən nəql olunan məşhur bir rəvayətə görə namazı bu cür tərk edən şəxs kafir olmur.

Buna görə də namazı tərk edən şəxsi mütləq bir şəkildə təkfir edənlər, onlara müxalif olanları batil Murciəlikdə ittiham edə bilməzlər.

Buna müvafiq olaraq tənbəlliyindən dolayı namazı tərk edən şəxsi kafir saymayanlar da, özlərinə qarşı müxalif mövqedə olanları azğın Xəvariclikdə ittiham edə bilməzlər.

4. Bu dünyada[1] namazı tərk edənləri təkfir etmək rəyini daha məqsədə uyğun hesab edənlərə görə, onu tərk etmək axirətdə sahibinin üzərinə çəkilən böyük küfr hesab olunur.

Şərtlərin mövcudluğu və maneələrin aradan qalxması ilə bu dünyada ixlasla "Lə iləhə illəllah" kəlməsini tələffüz edən müəyyən şəxsə böyük küfr olaraq hökm verib, sonra da "o şəxs axirətdə Allahın istəyi altındadır, yəni istəsə onu bağışlayar, istəsə də ona əzab verər" – demək Əhli Sünnənin sözlərindən deyil. Çünki şərtlərin mövcudluğu və maneələrin aradan qalxmasından sonra təkfir mövqeyini daha məqsədəuyğun sayanlar, namazı tərk edənin əbədi olaraq Cəhənnəmdə qalacağını söyləyir və deyirlər ki, namaz qılmayanın qəlbində imandan əsər-əlamət yoxdur. Çünki o, doğrudan da Lə iləhə illəllah - demiş olsaydı heç vaxt namazı tərk etməzdi.

5. Beləliklə də namazı tərk edənin hökmü barəsində düzgün formada olan ixtilaf, iman qardaşlığını pozmayan və Əhli Sünnə arasında daha öncədən baş vermiş mötəbər bir ixtilafdır. Bu ixtilaf ilk sələflərin dönəmində, ümmətin qəbul etdikləri İmam Əbu Hənifə, İmam Malik, İmam Şafii, İmam Əhməd və başqa

---

[1] Onu qeyd etməyimiz zəruridir ki, zahirə verilən hökmlərlə batini hökmlər hər zaman eyni olmur. Yəni birisinin zahirinə verilən hökm, onun batininə də eyni hökmü vermək anlamında deyil. Buna misal olaraq özünü zahirdə müsəlman kimi gööstərən münafiqi göstərmək olar. Şəkk yoxdur ki,məsələ aydındır.

alimlərin arasında olmuş və bu günümüzədək davam edərək Albani, İbn Bəzz, İbn Useymin (Allah onlara rəhmət eləsin) və başqa sünnəyə dəvət edib onu layiqincə yaşadan imamların arasında da davam etmişdir.

6. Bu məsələni elmi cəhətdən araşdıraraq, fiqhi baxımdan nəzər salaraq, Əhli Sünnənin dairəsi çərçivəsində bu iki rəydən birini götürüb, digərini tərk etmək olar. Lakin bu tərcihin istiqamətinin, o sözün mahiyyətinin müxtəlifliyini qorumaq, eləcə də elmi araşdırmanın prinsiplərinə və ixtilafın ədəb normalarına riayət etmək, yəni kimisə pisləyib acılamaqdan çəkinmək lazımdır.

7. Bizim bu məsələdə elm əhli arasındakı məzhəblərdən daha məqsədəuyğun gördüyümüz rəy yalnız əməli olaraq namazı tərk edənin təkfir olunmamasıdır.

Bizim bu rəyi daha məqsədəuyğun görməyimiz sözsüz ki, namazın şəninə əskiklik gətirmək, onu layiq olduğu məqamdan aşağılamaq anlamında deyil. Bizlər namazı tərk edəni zəlalətdə sayır[1], namazı adi bir şey sayanı böyük günah sahibi hesab edirik.

Yox əgər namazı tərk edən şəxs bunu etiqadən inkar edərək onu yalanlayar, onun vacibliyinə şübhə ilə yanaşar, onu tərk etməyi halal görər və ya ölümü

---

[1] Əgər belə olmasaydı onda bu tamamən qalan rüknlər yəni zəkat, oruc və ya həcc barəsində də deyilərdi. Bu da ki yekdilliklə batildir. Odur ki, bu məsələyə diqqət ver.

namaz qılmağa tərcih edərək ondan imtina edərsə, o zaman onun hökmü İslamdan çıxaraq böyük küfr etmiş kafir hökmündə olur və həmin şəxsi əmr sahibləri ümmətdən çıxmış mürtəd qismində öldürməlidirlər.

## 4. Allahın nazil etdiyi ilə hökm vermək.

1. Geniş mənası ilə Allahın hökmü ilə hökm vermək buna mükəlləf və layiq olan hər bir şəxs üçün Fərdu ayn hökmündədir və buna ehtiyac da var. İstər fərdi şəxs, istərsə də toplum halında[1] və ya istər rəhbər olsun, istər sə də əmr altında olan hər kəs öz imkanı dairəsində şəriətə aid olan hökm və vaciblərə müvafiq olaraq bunu etməlidir. Belə ki, hər kəs məsuldur və hər kəs öz rəiyyəti barəsində məsuliyyət daşıyır.

Şəri cəzaların yerinə yetirilməsi və bu kimi başqa işləri həyata keçirmək yalnız rəhbərlərin və ya onların tapşırdıqları məmurların üzərinə düşür.

2. Allahın nazil etdiyi ilə hökm vermək hər şeyə tam şəkildə şamil olunur və ümmətin əqidə, dəvət, elm, tərbiyə, əxlaq, iqtisadiyyat, siyasət, ictimai həyat və başqa hər işini özündə əhatə edir.

3. Allahın nazil etdiyi ilə hökm verməmək ən böyük fitnə və müsibətdir. Eyni zamanda müxtəlif bəlaların, təfriqənin, zəlillik və kiçikliyin ən böyük səbəblərindəndir. Günümüzdə bu həm fərdi, həm də camaat şəklində ümmətimizin əksər hissəsini bürüməkdədir. Ona görə də bu məsələyə önəmsizlik və diqqətsizlik vermək yolverilməzdir.

---

[1] Lüğəti mənada iki və ya daha artıq şəxsə camaat deyilir. Lakin bu partiyalara bölünməklə, qruplaşmalar yaratmaqla, ümməti parçalayaraq onu dağıtmaqla olmur.

4. Hökm üç növdür:

a) Nazil olunmuş hökm; Bu Allahın kitabındakı şəriəti və peyğəmbərinin sünnətidir. Hökmün bu növü şübhəsiz ki, bütünlükdə haqdır.

b) Təvil olunmuş hökm; Bu müctəhid alimlərin ictihadı ilə olur. Belə hökmlər doğru da ola bilər, səhv də. İctihad edən alimin isə ictihadı doğru olarsa o, iki əcr, səhv olarsa bir əcr əldə etmiş olur.

c) Dəyişdirilmiş hökm; Bu da Allahın nazil etmədiyi şeylərlə hökm verməkdir. Bunu etmək ya küfr, ya zülm, ya da fasiqlikdir.

İbn Qeyyim (Allah ona rəhmət eləsin) "Ruh" əsərinin sonlarında[1] bu məsələni izah edərək təfsilatına varmışdır.

5. Bir və ya bir çox hallarda Allahdan qeyrisinin hökmü ilə hökm verən şəxsin halına nəzər salmaq lazımdır.[2]

Əgər o, Allahın hökmünü halal görərək, şəkk edərək, yalanlayaraq verərsə, və ya fikirləşərsə ki, o, Allahın hökmü ilə qeyrisinin hökmü ilə hökm verməkdə ixtiyar sahibidir, yaxud deyərsə ki, Allahın hökmü insanların işlərini səhmana salmaq münasib deyil, və ya Allahdan qeyrisinin hökmü onlar üçün

---

[1] 655 – 657-ci səhifələr.

[2] Rəhbərlərin arasında dindən çıxmış kommunist, xaçpərəst kafir, qəbirlərə tapınan müşrik və buna bənzər başqa şəxslərin mövcudluğunu demək olmaz. Kimin halı belə olarsa hətta öz rəiyyətinə Quran və Sünnə ilə hökm versə belə kafir olaraq qalmaqdadır.

daha münasibdir, ya da buna bənzər mənada başqa ifadələr söyləyərsə, həmin şəxs şərtlərin mövcudluğu və maneələrin aradan qaldırılmasından sonra mötəbər rəbbani alimlərin fətvalarına əsasən İslam millətindən çıxmış kafir hökmündə olur.

Yox əgər rəhbər Allahın hökmünü öz nəfsi istəklərinə uyaraq, müəyyən mənfəət əldə etmək naminə, qorxu səbəbindən və ya cahillərin onun üçün etdiyi təvilə görə verməklə bərabər öz səhvini etiraf etmiş olarsa, bu kiçik küfr sayılır. Lakin bu sələmdən daha böyük, şərab içməkdən daha şiddətli günah hesab olunur.

Bütün bunlara baxmayaraq sələfi alimlərin dedikləri kimi bu əməl kiçik küfr sayılır.

Bu barədə varid olmuş dəlillərin ən səhih və ən açıq-aydın olanlarından biri, möhtərəm səhabə Abdullah ibn Abbas və onun bəzi tələbələrindən gəlib çatan, həm keçmiş, həm də müasir alimlərin səhih saydıqları hədisdir.

Bu hədisə tənə edərək onun haqqında şübhələr meydana gətirmək bəzi müasirlərin, xələfin işidir.

6. Allahın nazil etdiyi ilə hökm vermək məsələsi ilə bağlı qeyd olunan elmi təfsilat, əhli sünnənin yolu və sələfin mənhəci sayılan dürüst rəydir.

Bu məsələdə həddini aşaraq, ifrata vararaq, dikbaşlıq edən kəs Xəvariclərə müvafiq olur.

Eləcə də kim bu məsələyə laqeyid yanaşaraq, məsələyə önəm vermədən ondan üz döndərərsə Murciələrə müvafiq olur.

Kifayətdir ki, Allaha şükür biz müasir dövrümüzdə ən böyük sünnə imamlarından olan İbn Bəz, Albani və İbn Useyminin (Allah onlara rəhmət eləsin), habelə onların ardıcılları olan müasir alimlərin etiqad edərək yaşayıb dünyalarını dəyişdikləri rəy üzərindəyik.

Əgər etimad olunan alimlərdən kimsə bu təfsilata müxalif olaraq, qanunlar icad etməyi daha əfzəl və halal görmək və ya bu cür başqa mənalarda açıqlayarsa, biz ona bu hökm və rəydə müxalif olmağımıza baxmayaraq, bu həmin alimlər tərəfindən təqdim olunan mötəbər ictihad sayılır.

Bu cür alimlərdən elm və din baxımından kimsə müxalif olarsa nəticədə, onun düzəlişinə müvafiq olmaq şübhəsiz ki, hökmün əsası hesab olunur.

7. Əmin - amanlıqla olunan dəvət və imanla əldə edilən elm vasitəsilə Allahın şəriəti ilə hökm verilməyən ölkələrdə Onun hökmünün verilməsinə, müsəlmanları birləşdirərək Peyğəmbərin ﷺ mənhəcinə uyğun olan İslamın yayılmasına səy göstərmək şəriət baxımından vacibdir. Bu da Uca Allahın aşağdakı ayəsinə: **“Bir qövm özlərində olanı dəyişməyincə Allah da onları dəyişməz”** – ayəsinə uyğun dəyişikliklə, Kitab və Sünnəyə sarılaraq, yaxşı əməl və təqva üzərində əməkdaşlıq edərək, haqqa və səbrə tövsiyə

edərək, müsəlmanların əqidələrinə nüfuz etmiş bidət və qüsurları təmizləyərək və onları aşıq-aşkar haqq yoluna dəvət edərək olunmalı, məşum partiyaçılıq, iyrənc təəssübkeşlik, qırğına çıxmaq və ya sarsıdıcı təlaş yaratmaqla olmamalıdır.

Şübhəsiz ki, istər fərdi, istərsə də toplum halında insanların əqidə və ibadətlərinin düzəldilməsinə önəm vermək, rəhbərlərə qarşı döyüşmək və mübarizə aparmaqdan daha çox önəmlidir. Çünki bunu etmək Kitab və Sünnədə buna açıq-aydın qadağaların olması bir kənara, ümmətə fitnə, müsibət və bəlalar gətirmiş olur.

# 5. İslamda dost və düşmən anlayışı.

1. Allaha və Onun rəsuluna itaət olunma çərçivəsində etimad olunan sələfin mənhəcinə və rəbbani alimlərin yoluna uyğun şəkildə müsəlmanların həm öz aralarında, həm də ümumən müsəlmanlara qarşı dostluq prinsipinə riayət etmələri vacibdir.[1]

---

[1] Dost və düşmən anlayışının İslam dinində xüsusi yeri vardır və bu, imanın ən etibarlı ipi hesab olunur. Məqsəd isə müsəlmanlar arasında sevgi və ülfət yaratmaq, habelə düşmənlərdən uzaq olmaqdır. İbn Abbas ﵄ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "İmanın ən etibarlı ipi, Allah üçün dostluq etmək, Alla üçün düşmənçilik etmək, Allah üçün sevmək, Allah üçün nifrət etməkdir."

Şübhəsiz ki, Allah və Rəsulunu sevdikdən sonra, Allahın dostlarını sevmək, düşmənlərinə də nifrət bəsləmək lazımdır. Hər bir müsəlmanın, bu dinin mənsubları ilə dostluq edib, düşmənlərinə nifrət bəsləməsi İslam əqidəsinin əsaslarındandır. Buna görə də hər bir müsəlman Tövhid və İxlas əhlini sevib, onlarla dostluq etməli, şirk əhlinə isə nifrət edərək onlarla düşmənçilik etməlidir. Uca Allah əl-Maidə surəsinin 51–ci ayəsində buyurur: «Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı əsla doğru yola yönəltməz».

əl-Mumtəhinə surəsinin 4-cü ayəsində isə Rəbbimiz buyurur: «İbrahim və onunla birlikdə olanlar sizin üçün gözəl örnəkdir. O, zaman onlar öz qövmünə belə demişdilər: Şübhəsiz bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərinizlə heç bir əlaqəmiz yoxdur. Biz sizin dininizi inkar edirik. Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır».

**Dost və Düşmən məsələsində insanların qisimləri:**

**Birinci qrup:** Nifrət edilməkdən uzaq olaraq yalnız və yalnız sevilməyə layiq olan kimsələrdir.

**İkinci qrup:** Allah üçün sevilməyib, dostluq edilməyib, yalnız və yalnız nifrət və düşmənçilik edilməyə layiq kimsələrdir.

Digər tərəfdən az və ya çox olmasından, əqidə və ya hökmlərlə bağlı olmasından, küfr, günah və ya bidət olmasından asılı olaraq şəriətə müxalif olanlardan və müxalif olduqları məsələlərdən uzaq olmağımız da vacibdir.

Bu məsələdə səhlənkarlıq etmək qəbuledilməz etinasızlıq və keçərsiz ihmaldan başqa bir şey deyildir.

2. Günəş kimi açıq-aydın olan küfrü görmədiyimiz müddətdə günah işlər görsələr belə müsəlman rəhbərlərə qarşı çıxmaq, onlarla olan əhdi pozmaq, onlara qarşı üsyan etmək olmaz.

Əgər onlar belə bir küfrə yol vermiş olsalar qüdrətin mövcudluğu şərtilə, əvvəla onlara qarşı çıxmaq hökmünü, sonra da bunu əməli olaraq həyata keçirməyi, bununla bərabər mötəbər və sabit elm əhlinin müdrik rəylərini nəzərə almaq gərəkdir. Belə ki, onlar bu uzaqgörənlikləri sayəsində anlayırlar ki, hal-hazırda bu münkəri aradan qaldıra bilməyib, əksinə onu artıracaqlar. Bunun üçün təkcə fərdi emosiyalara uymaq və ya güclü həvəs duyğuları kifayət deyildir.

Hər hansı bir məsələyə hökm verdikdə həmin məsələnin zamanını və məkanını nəzərə almaq və məsələləri bir-birinə qarışdırmadan nəzərdən keçirmək lazımdır.

---

**Üçüncü qrup:** Bir tərəfdən sevilməsi və bir tərəfdən də nifrət edilməsi lazım olan kimsələrdir.

3. İstər alimlər, istərsə də elm tələbələrindən sələfi olan qardaşlarımızın arasında baş verən elm və ya mənhəc ixtilafı baş verərkən, saleh sələfin anladıqlarına müvafiq olaraq şəri hüccətə və dini dəlillərə əsaslanmaq, eləcə də böyük alimlərin məsləhətlərinə qulaq asmaq gərəkdir.

İslamda dost və düşmən bayrağı yalnız haqq mənhəcinə və onun üsullarına əsasən qaldırılmalıdır.

Haqq əhlindən kimsə etiqadi məsələlərdə və ya mənhəc qaydalarında xətalara yol verdikdə onlara nəsihət vermək və xatırlatmaq lazımdır. Əgər həmin şəxs xatırlanıb, nəsihət olunduqdan sonra haqqı qəbul etməməkdə israrlı olarsa, o zaman həmin şəxs uzaqlaşdırılar, tərk olunar və ondan həzər olunar.

Çünki haqq daha dəyərli, düzgün rəy daha üstündür.

Nəsihət və bəyan edilməmişdən öncə kimisə uzaqlaşdırıb, tərk etmək isə inadkar, həddini aşmış təəssübkeşlərin əməllərindəndir.[1]

---

[1] **Kafirlərlə dostluq etməyin təzahürləri.**

1 – Geyim, söz və s. kimi (zahiri) əməllərdə kafirlərə bənzəmək.

2 – Kafirlərin diyarında yaşamaq və dinini qorumaq üçün onların diyarından müsəlman diyarlarına hicrət eməkdən imtina etmək.

3 – Dincəlmək, əylənmək və zövq almaq məqsədilə kafirlərin diyarına səfərlər (səyahət) etmək.[1]

4 –Müsəlmanlara qarşı kafirlərə yardım etmək, onları dəstəkləmək, onları tərif etmək və qorumaq.

5 – Kafirlərdən kömək istəmək, onlara etibar edərək güvənmək, müsəlmanların sirlərini öyrənəcək vəzifələrə onları təyin etmək, onları sirdaş və məsləhətçi seçmək.

Rəvayət olunur ki, Aişə demişdir: “Peyğəmbər ﷺ Bədr döyüşünə çıxdığı zaman bir nəfər müşrik onu təqib edərək Hərra adlanan yerdə onlara çatıb dedi: «Səni təqib etmək və səninlə müvəffəqiyyət qazanmaq istəyirəm». Bu zaman Peyğəmbər ﷺ: «Allaha və Onun Rəsuluna iman gətirmisənmi?» deyə soruşdu. Həmin adam: «Xeyr» - deyə cavab verdikdə Peyğəmbər ﷺ dedi: “Geri dön! Çünki biz müşrik birisindən əsla kömək istəmərik.» Hədisi Muslim və Əhməd rəvayət etmişlər.

6 – Kafirlərin bayramlarında, habelə bu bayramlar münasibətilə düzənlənmiş mərasimlərdə iştirak etmək, bu bayramların qurulmasında yardımçı olmaq və onları bu münasibətlə təbrik etmək.

7 – Kafirləri inkişaf və mədəniyyətlərinə, əxlaqlarına görə tərif etmək, batil inanc və dinlərinə baxmayaraq əxlaq və məharətlərini bəyənmək.

8 – (Oğlan və qız) uşaqlarına kafir adları vermək.

9 – Kafirlər üçün Allahdan bağışlanma diləmək və onlara rəhmət oxumaq.

**Möminlərlə dostluq etməyin təzahürləri:**

1 – Kafirlərin diyarlarını tərk edib, müsəlmanların diyarlarına hicrət etmək.

2 – Müsəlmanlara dini və dünyavi məsələrdə ehtiyac duyduqları şeylərdə onlara can, mal və sözlə dəstək olmaq və onlara kömək etmək.

3 – Müsəlmanların kədər və acılarına üzülmək, sevinc və fərəhlərinə sevinmək.

4 – Müsəlmanlara nəsihət etmək, onların yaxşılığını istəmək və onları aldatmamaq.

5 – Müsəlmanlara hörmət etmək, onlara ehtiram göstərmək və onları söyməkdən və alçaltmaqdan çəkinmək.

6 – Çətinlikdə də, asanlıqda da, müsəlmanları ziyarət etmək, onları görməkdən və onlarla görüşməkdən xoşlanmaq və müsəlmanlarla birlikdə olmaq.

7 – Müsəlmanların haqlarını qorumaq.

8 – Zəif və gücsüz müsəlmanlarla yumşaq davranmaq və onlarla gözəl rəftar etmək.

9 – Müsəlmanlara dua etmək və onlar üçün istiğfar diləmək.

---

**Dünyəvi işlərlərdə kafirlərlə iş görmək dostluğa aiddirmi?**

Səhih dəlillərə əsasən kafirlərlə dünyəvi məsələlərdə – alış-veriş etmək, icarə vermək və ya almaq, müvəqqəti bir şey almaq kimi əməllərlə müamələ etmək olar. Lakin bu yalnız zərurət halında, dar bir çərçivədə, İslama və müsəlmanlara zərər verməyəcək miqdarda olmalıdır. Belə ki, Peyğəmbər ﷺ Abdullah ibn Ureyqiti yol göstərən bir adam olaraq icarəyə götürmüşdü.[1]

Həmçinin, Peyğəmbər ﷺ öz zirehini yəhudi birisinə müəyyən miqdarda arpa müqabilində girov qoymuşdu. Habelə Əli ؓ, öz quyusundan ona on altı qab su çıxaran yəhudi qadına mükafat olaraq on altı xurma vermişdir. Həmçinin, Peyğəmbər ﷺ Mədinədə yaşayan yəhudilərdən müşriklərə qarşı döyüşdə kömək istəmişdir. Həmçinin, Məkkə müşriklərinə qarşı Xuzaənin köməyindən istifadə etmişdir. Bu kimi əməllər dost və düşmən anlayışına zərər yetirmir, bir şərtlə ki, müşriklər müsəlmanların arasında etik qaydalara riayət etsinlər və onları öz dinlərinə çağırmasınlar.

## 6. Murciələr.

1. Murciələr zəlalət firqəsidir. Onların məzhəbi sünnə əhlinin yoluna müvafiq olmadığına görə qəbahətli və batil hesab olunur.

Buna rəğmən İmam Əhmədin dediyi və Şeyxul İslam İbn Teymiyyənin "Fətvalar məcmusu" əsərində ondan müxtəlif yerlərdə[1] nəql etdiyi kimi biz onları İslam ümmətindən kənar hesab etmirik.

2. Murciələr aşağıdakı növlərə ayrılır:

a) **Cəhmiyyə murciələri**: Onlar deyirlər ki, iman sadəcə olaraq bilməkdən ibarətdir. Cəhmiyyələrə müvafiq olduqlarına görə bəzi sələf alimləri onları kafir saymışdırlar.

b) **Kərramilər:** onlar deyirlər ki, iman qəlblə etiqad etməkdən deyil, yalnız dillə deməkdən ibarətdir.

c) **Fəqih murciələr[2]:** Onlar deyirlər ki, iman qəlblə etiqad etmək və dillə söyləməkdən ibarətdir. Əməli isə onlar iman məfhumundan xaric hesab etmişlər.

d) **Əşarilər**: Onlar imanın yalnız təsdiqdən ibarət olduğunu deyirlər. Şeyxul İslam ibn Teymiyyə "Fətvalar məcmusu" əsərində[3] bu məsələnin təfsilatına varmışdır.

---

[1] (12/486) və (23/348)

[2] "Fətvalar məcmusu" əsərində olduğu kimi Şeyxul İslam (Allah ona rəhmət eləsin) Fəqih murciələrlə olan ixtilafın, sadəcə olaraq ləfzi ixtilaf olduğunu daha üstün saymışdır. Bizim rəyimizə görə isə bu ixtilaf həqiqi ixtilafdır. Necə ki, təqribən 25 il bundan öncə Şeyximiz Albani (Allah ona rəhmət eləsin) "Təhavi əqidəsi: şərh və əlavələr" əsərində (62-63-cü səhifələr) bəyan etmişdir.

[3] (7/555-556)

Bütün bu firqələrin hamısı miqdarında fərqlənsələr belə zəlalətdədirlər.

3. Murciələr müxtəlif firqələrdən ibarət olmaları ilə yanaşı onların ən iyrənc sözlərindən biri də: "iman artmır və azalmır" sözüdür. Bu da o deməkdir ki, ən pis asilərlə ən böyük itaət sahiblərinin imanları eyni səviyyədədir.

Bəziləri də buna bənzər başqa azğın söz deyirlər ki; "iman kamil olmazsa, düzgün iman sayılmaz"[1].

"İman arır və azalır", "itaətlərlə çoxalır, günahlarla isə azalır", "iman söz və əməldən ibarətdir" – deyən kəs isə bütünlüklə yerli-dibli Murciələrdən uzaqlaşmış olur. Bunu Sünnə imamları: İmam Abdullah ibn Mübarək, İmam Əhməd ibn Hənbəl, İmam əl-Bərbəhari və başqa hədis alimləri demişdirlər. (Allah onlardan razı olsun)

Bu baxımdan bu sözlərdən uzaqlaşmaq və ya barəsində təşviş yaratmaq keçici xəyal və cahillikdir.

4. Şirk istisna olmaqla qiblə əhlindən olan böyük və ya kiçik günah sahibləri əzabla vəd olunma cəzasına məhkumdurlar. Uca Allah buyurur: **"Şübhəsiz ki Allah Ona şərik qoşanın günahlarını heç vaxt bağışlamaz, ondan başqa günahları isə dilədiyinə bağışlayar."**

---

[1] Bu söz özü-özlüyündə Xəvariclərin dedikləri ilə eyni mənanı verir. Çünki hər iki firqənin şübhələrinin mənbəyi eynidir. Növbəti fəsildə bunları qeyd edəcəyik.

Əgər kimsə həmin əməllərdən hər hansı birisini halal görərsə, yaxud hər hansı bir küfrə yol vermiş olarsa, mötəbər şərtlər çərçivəsində İslam ümmətindən çıxaraq mürtəd olar.[1]

---

[1] İstərdim bu məqamda qısaca olaraq İslamda əqidə məsələsində əsas məzhəblərin yaranma tarixinə nəzər salaq. Çünki bu məzhəblər birdən-birə deyil, tədricən yaranmışdır. İlk öncə onu qeyd edək ki, firqələrin adları ya onların rəhbərlərinin adına nisbət olunur (məsələn Cəhmiyyə firqəsinin adı rəhbərləri Cəhm ibn Səfvanın adı ilə bağlıdır), ya da onların etdikləri əməllərə nisbət olunur (məsələn: Xavariclər, rəhbərə qarşı çıxdıqlarına görə, Şiələr özlərini Əliyə tərəfdar saydıqlarına görə və s).

- Islam ümmətində baş vermiş ilk bidət **Xavariclərin** bidəti olmuşdur. Bu ilk dəfə hələ peyğəmbərin vaxtında baş vermişdi. O zaman onların rəhbəri Bənu Təmim qəbiləsindən olan Zul-Xuveysira ət-Təmimi adlı kəs Peyğəmbər qəniməti insanlar üçün bölərkən ona üz tutaraq: Ey Muhəmməd, ədalətli böl! - demişdi. Peyğəmbər də cavabında demişdi: Vay sənin halına, mən ədalətli olmayandan sonra bəs kim olacaq? Bunu eşidən Ömər dedi: Ey Allahın rəsulu, icazə ver bunun boynunu vurum. Sonra peyğəmbər demişdi: Bunun belindən elə insanlar çıxacaq ki, ox öz yayından çıxdığı kimi onlar da dindən çıxacaqlar. Sonradan Osman ibn Əffanın xilafətinin sonlarında və Əli ibn Əbu Taliblə Müaviyə ibn Əbu Sufyan arasında fitnə baş verdikdə Xəvariclərin fitnəsi artmış və onlar müsəlmanları, o cümlədən səhabələri təkfir edərək onların qanlarını halal görmüşdülər.

- Xəvariclərdən sonra İslam ümmətinin məcusiləri hesab olunan **Qədərilərin** fitnəsi meydana çıxmışdı. Onlar iddia edirdilər ki, Uca Allah qullarının əməllərini öncədən təqdir etmir. İnsan özü müstəqil olaraq öz əməllərini edir. İnsanların əməlləri Allahın istəyinə bağlı deyil. Əməlləri Allah yaratmır. Hətta iş o yerə çatmışdı ki, onların həddini aşmış rəhbərləri deyirdilər ki, insanların edəcəyi əməllər Allaha bəlli deyil. Həmin əməllər Lövhi məhfuzda yazılmayıb. Bu məzhəb səhabələrin dönəminin sonlarında meydana çıxmışdı. Abdullah ibn Ömər Ubadə ibn Samit və bir sıra digər səhabələr bu bidətin şahidi olmuşdular.

- Sonra Tabiinlərin zamanında əməli imandan kənar hesab edən **Murciələr** meydana gəlir. Onlar deyirdilər ki, günah imana təsir etmir, onu azaltmır. Möminsənsə gedib zina etsən belə, şərab içsən belə adam öldürsən belə, hətta bütün günahları etsən belə sən kamil iman sahibisən.

Bura qədər sadalanan məzhəblər Şeyxul İslam ibn Teymiyyənin dediyi kimi, itaət və günah, mömin və fasiq məsələlərində bidətlər edərək yollarını azmışdılar. Onlar Allah, onun zatı, ad və sifətləri barəsində heç bir şey danışmamışdılar.

- Sonra yeni bir bidət **Mutəzilə** məzhəbi meydana gəlir. Onlara (əzkiyə) ağıllılar da deyilir.  Onlar ağılı vəhydən üstün tutmağa başlayırlar. Bu da Vasil ibn Əta adlı şəxsin Həsən əl-Bəsrinin məclisindən narazı olaraq ayrılmalarından sonra başvermişdir. Məzhəbin adı da elə bununla bağlıdır. Tabiinlər o zaman belə demişdilər: "İtəzəlu annə fəsummu Mutəzilə", yəni onlar bizdən ayrıldılar və ayrılmışlar adlandılar. Onların məzhəbinə "mənzilə beynə mənziləteyn" yəni iki rəy arasında bir rəy də deyirdilər. Yəni onlar deyirdilər ki, günah işlər görən şəxs nə Murciələr dediyi kimi mömindir,nə də Xavariclər dedikləri kimi kafir. Onların arasında bir başqa hökmdədirlər. Sanki bir nəfər öz şəhərindən səfərə çıxaraq bir başqa şəhərə çatmaq məqsədilə yola düzəlir və yolun ortasında qalır. Nə öz şəhərində olur, nə də getmək istədiyi şəhərə çata bilir. Mutəzilələrin də halı beləsinə bənzəyir. Bu məzhəb müsəlmanların arasında geniş vüsət aldıqdan sonra yeni bir məzhəb Cəhm ibn Səfvan və onun tərəfdarlarının yaratdıqları Cəhmiyyə məzhəbi yaranır. Onlar artıq mömin,kafir və ya fasiq məsələləri barəsində deyil Allah Subhanəhu va təalənin zatı barəsində yeni fikir və mülahizələr irəli sürməyə başlayırlar. Bu minvalla İslamın ilk dönəmlərində bidətlər meydana gəlir və insanlar yavaş-yavaş öz Yaradanları haqqında, Onun ad və Sifətləri barəsində ağılla danışaraq bunu ağıl qəbul edir, bunu isə etmir- deyirlər. Cəhmiyyələr də öz növbələrində bir neçə qismə bölünürlər:

- Bir qism: Nə Allah mövcuddur, nə də Allah mövcud deyil-demək olmaz. Çünki Allah mövcuddursa digər mövcudlara oxşamış olur. Yox əgər mövcud deyilsə mövcud olmayanlara bənzəmiş olur. Bunlar da əslində bir ziddiyyət hesab olunur. Bir-birinə zidd olan iki şey heç zaman birləşə bilməz.(Məsələn: Gecə və gündüz kimi).

- İkinci qism deyir ki, Allahı isbatla vəsf etmək olmaz, inkarla vəsf etmək olar. (Yəni demək olmaz ki, Allahu Alim yəni Allah Biləndir, demək olar ki, Allah cahil deyil).

- Üçüncü qism deyir ki, Allahın adlarını isbat edirik, sifətlərini isə yox. (Yəni, Allahu Alim bilə İlm, Allah Biləndir, lakin elmə malik deyil, Allahu Həkim bilə hikmə, Allah Hikmət sahibidir, lakin hikməti yoxdur.

- Dördüncü qism deyir ki, Allahın adlarını qəbul edirik, sifətlərindən də bəzilərini olduğu kimi qəbul edirik, qalanlarını isə təvil yəni təhrif edərək adlarını dəyişdiririk. Bunlar da İslam aləmində ən geniş yayılmış əqidələr hesab olunan Əşarilər və Məturidilərdir ki, onlar da ümumilikdə iyirmi sifəti olduğu kimi qəbul edir, qalanlarını isə təvil edib mənalarını dəyişdirirlər. Bütün bu dörd qismin hamısının əsas günahkarı isə Cəhm ibn Safvandır. Belə ki, Muslimin Səhih əsərində Cərir ibn Abdullah əl-Bəclidən rəvayət olunan hədisdə Peyğəmbər demişdir: “Kim İslamda pis bir yolun əsasını qoyarsa bunun günahı, üstəlik Qiyamətədək o əməli edənlərin günahı ona yazılar.

# 7 – Xəvariclər.

1. Xəvariclər zəlalət firqəsidir. Onların tutduqları yol pis və batildir. Biz onları kafir hesab etməsək belə, onlar Əhli Sünnə vəl-Camaanın mənhəcindən çıxmış sayılırlar. Onu da qeyd etməliyik ki, bəzi sələflərin onları təkfir etməsi variddir.

2. Əhkamlar baxımından Xəvariclər Murciələrlə bir-birinə əksdirlər. Çünki onların hər ikisinin ideya mənbəyi eyni bidət və zəlalət fikridir. Bu fikir də, onlara görə imanın bütöv bir anlam olması, bölünməz olması və artıb azalmamasından ibarətdir.

Onlar bu fikirə əsaslanaraq yollarını azmış və azğınlığa düşmüşlər.

Buna əsasən də Xəvariclərə görə imanda olan hər hansı bir naqislik küfrdür. Çünki onların rəyincə günah imanın hamısını aparıb yox edir.

Bunun əksinə olaraq Murciələr isə deyirlər ki, günahlar nə qədər olursa olsun nəinki imanı yox etməz, hətta ona təsir edib onu azaltmaz. Həmçinin hər hansı bir itaət imanı artırmaz.

Elə bu batil inanca əsaslanaraq öz məşhur və ağlasığmaz sözlərini demişlər: "Əgər iman mövcuddursa, ona günahlar təsir etməz!"[1]

---

[1] Bildiyimiz kimi İslam ümmətində baş vermiş ilk bidət **Xavariclərin** bidəti olmuşdur. Sonradan Osman ibn Əffanın xilafətinin sonlarında və Əli ibn Əbu Taliblə Müaviyə ibn Əbu Sufyan arasında fitnə baş verdikdə Xəvariclərin fitnəsi artmış və onlar müsəlmanları, o cümlədən səhabələri təkfir edərək onların qanlarını halal görmüşdülər.

Xəvariclər Hərura adlanan yerdə çıxdıqlarına görə onlara Hərurilər də deyilir. Həmçinin onlara Nəhruvan əhli də deyilir. Ümumilikdə isə Xavariclər bir neçə qrupa bölünürlər:

**1-İbadilər**: Bunlar Abdullah ibn İbad əl-Mərri ət-Təmiminin ardıcıllarıdır. Onlar xəvaric firqələri arasında nisbətən ən az hədlərini aşanlar hesab olunur. Yəqin ki elə bu səbəbdən də onlar günümüzədək mövcuddurlar. (Oman və əl-Cəzair) İbadilərə görə qiblə əhlindən olara müxalif olan hər kəs kafirdirlər. Onlara görə böyük günah sahibləri ümmətdən çıxaran küfr deyil, nemətə qarşı nankorluq küfrü etmişlər. Müasir İbadilər xəvaric olduqlarını danmağa çalışır və dörd məzhəb kimi onların da fiqhi məzhəbə sahib olduqlarını bildirirlər. İbadilər də öz növbələrində bir neçə firqəyə bölünürlər: Həfsilər, Yezidilər və Harisilər.

**2- əl-Əzəriqa**: Bunlar Nafi ibn əl-Əzraqın ardıcıllarıdır. Bu növ xavariclər ən çox ifrata varanlardır. Onlar osmanı, Əlini, Talhəni, Zubeyri və onlarla birlikdə olan bütün müsəlmanları kafir heab edirlər.

**3-Nəcdat**: Bunlar Nəcdə ibn Amir əl-Hənəfinin ardıcıllarıdır. Onların fitnəsi İbn Zübeyrin zamanında baş qaldırmışdı. Əvvəlcə Nacdə Nafi ibn əl-Əzraqın ardıcıllarından idi. Sonra ondan ayrılaraq müstəqil bir məzhəb yaratmışdı. Onlar digər xavariclər kimi böyük günah sahibini kafir hesab etməklə kifayətlənməyərək kiçik günah üzərində israr edən kəsi müşrik adlandırırdılar.

Peyğəmbər ﷺ Qiyamətdən öncə bir camaatın meydana çıxaraq küfr əhlini buraxıb, iman əhlini qətlə yetirəcəyi barədə xəbər vermişdir. Həmin qövmün əsasını qoyan ilk şəxs peyğəmbərə utanmazcasına "Ey Muhəmməd, ədalətli böl! - deyə xitab etmişdi. Peyğəmbər bu qövmü vəsf edərək demişdir: "Axır zamanda bir qövm çıxacaq, onlar hikmət və təcrübədən uzaq bir camaat olacaqlar. "Onlar Quranı oxuyacaq, lakin oxuduqları hulqumlarını keçməyəcəkdir." Yəni Quranı gözəl bir tərzdə oxumağı bacaracaqlar, lakin onu anlayaraq mənalarını dərk etməyəcəklər. Sonra buyurur: "Onlar ən gözəl sözləri danışacaq, ox öz yayından çıxıdığı kimi onlar da dindən çıxacaqlar."

Xəvaric sözü ərəb dilində "xuruc" yəni çıxmaq, xaric olmaq sözündən əmələ gəlmişdir. Xəvariclərin ilk dəfə meydana gəlməsi barədə rəvayət olunur ki, Müaz ibn Cəbəl peyğəmbərə yerdən təzə çıxarılmış bir qədər xam qızıl göndərir, peyğəmbər də həmin qızılı İslamı

yenicə qəbul etmiş bəzi müsəlmanları İslam dininə həvəsləndirmək üçün onların arasında bölməyə başlayır. Bu zaman saçı və saqqalı sıx və dağınıq olan Zul Xuveysira ət-Təmimi adlı birisi gəlib dedi: ”Ey Muhəmməd, ədalətli ol, and olsun ki, bu bölgü Allahın buyurduğu kimi olmadı”. Peyğəmbər də cavabında ona dedi: “Vay sənin halına, mən ədalətli olmayandan sonra bəs kim olacaq?” Digər bir rəvayətdə deyir ki; Səmada olan Allah bu dini mənə əmanət etdiyi halda siz mənim ədalətsiz olduğumu bildirirsiniz? Bu zaman səhabələrdən bəziləri: İcazə ver bu münafiqin boynunu vurum ey Allahın rəsulu-deyə qılınca əl atırlar. Lakin peyğəmbər bununla razılaşmır və buyurur: “Vaxt gələcək bunun vəsfində bir qövm çıxacaq, siz öz namazlarınızı onların namazları ilə müqayisədə kiçildəcəksiniz. Eləcə də Quran oxumaqda da onlar sizdən üstün olacaqlar. Sonra buyurur: ”Onlar ən gözəl sözləri danışacaq, ox öz şikarının bədəninə nüfuz edib çıxıdığı kimi onlar da dindən çıxacaqlar.” Yəni burada alimlər müqayisə edirlər ki, insan oxu şikara tərəf tuşlayıb yayı çəkib qüvvətlə atdıqda, ox elə sürətlə heyvanın bir tərəfindən girib o biri tərəfindən çıxır ki, oxun nə uc hissəsində, nə də arxasında lələk hissəsində qandan əsər əlamət olmur. Xəvariclər də İslamdan elə sürətlə çıxırlar ki, onlarda da İslamdan heç-bir əsər əlamət qalmır. Sonra peyğəmbər buyurur: “Onlar küfr əhlini qoyub İslam əhlini qətlə yetirəcəklər. Allaha and olsun ki, onları görsəm Ad qövmü tək onları məhv edəcəyəm. Xavariclərin əsas xüsusiyyətlərindən biri də onların böyük məsələlərə laqeyid yanaşmaları, adi məsələləri isə böyütmələridir. ”Rəvayət olunur ki, xavariclərdən bəziləri Abdullah ibn Abbasın yanın gəlib soruşurlar ki; Ey Abdullah, mən Həccdə olarkən birdən əlimə milçək qonmuş olsa və mən o milçəyi vurub öldürsəm nə etməliyəm? İbn Abbas da ona deyir ki: Subhənallah, milçəyin öldürdüyünə görə sıxılırsan, amma müsəlmanların qanını axıtmaqdan sıxılmırsan?”

Xəvariclərin zühuru barədə üç rəy vardır:

1 – ci rəyə gör onların birincisi Zul Xuveysira ət-Təmimi olmuşdur.

2 – ci rəyə görə Xəvariclər Osman ibn Əffanın xilafətinin son dövrlərində meydana gəlmişdir.

3 – cü rəyə görə isə Əli ibn Əbu Taliblə Müaviyə ibn Əbu Sufyan arasında baş vermiş Sıffin döyüşündən sonra təhkim məsələsindən

sonra meydana gəlmişlər. O zaman Əli Müaviyə ilə razılığa gəlir ki, bir nəfər sən tərəfdən, bir nəfər də mən tərəfdən gəlsin aramızda hökm verək. Həmin vaxt Əlinin ordusundan ayrılan Xavariclərin sayına gəlincə isə bəzi mənbələrdə 6000, bəzilərində 8000 digər mənbələrdə isə 16000 olduğu qeyd olunur. Yəni Əlinin 120000-lik qoşunundan bunlar ayrılaraq etirazlarını bildirməyə başlayırlar ki, sən Allahın kitabını buraxıb insanlar vasitəsilə hökm verdin. Əli də bir quran gətirib önünə qoyur və deyir: Ey Quran bizim aramızda hökm ver. Onlar sən kağızla danışırsan?-deyə soruşduqada Əli ibn Əbu Talib də onlara cavabında deyir ki, mən də Allahın kitabı ilə hökm verən insanlar seçmişdim ki, bizim aramızda hökm versin. Yəni bunlardakı səfehliyin səviyyəsinə baxın. Əli qan tökülməsinin tərəfdarı olmadığından onlara səbr edirdi. O xavariclərə deyir ki, bizi kafir hesab etməyinizə baxmayaraq üç məsələyə riayət edəcəyimizə söz veririk:

1-Siz bizə qarşı vuruşmayınca, biz də sizlərə qarşı vuruşmayacağıq. 2- i sizi Beytul maldan ayrılan pullardan və qənimətlərdən məhrum etməyəcəyik. 3- Sizin camaat namazlarında iştirak etmənizə qadağa qoymayacağıq.

Bir müddət sonra Xəvariclər yenə müsəlmanlar arasında qarışıqlıq salmağa başlayırlar. Əli onlarla oturub mübahisə etmək istəyir onlar razı olmurlar. Sonra o, ən elmli səhabələrdən biri olan Abdullah ibn Abbası onların yanına göndərir. İbn Abbas da gözəl bir libas geyinib onların yanına yollanır. Gəlib onların yanına çatdıqda oradakıların sayı təqribən 8000 min nəfər idi. Ən birinci İbn Abbası görən kimi onun gözəl libasına ayıb tutmağa başlayırlar ki, bu nə qiymətli paltardır geyinmisən, bəs zuhd deyilən şey haradadır? İbn Abbas da onlara cavabında bu ayəni deyir: "**De: "Allahın Öz qulları üçün üzə çıxartdığı zinəti və təmiz ruziləri kim haram etmişdir?" De: "Bunlar dünya həyatında (hamıya), Qiyamət günü isə yalnız möminlərə məxsusdur". Biz dərk edən adamlar üçün ayələri belə izah edirik.**

Sonra deyir ki, mən sizin yanınıza ən xeyirli insanlar olan səhabələrin yanınadan gəlmişəm. Siz onlarda nəyi ayıb tutursunuz? Deyirlər ki: Üç şeylə razı deyilik: 1-si Əli Allahın hökmünü qoyub insanlar vasitəsilə hökm vermişdir. Allah təalə isə buyurur ki: "İnil hukmu illə lilləh" **(Hökm yalnız Allaha məxsusdur).** 2 – ci deyirlər ki Əli Cəməl döyüşdən sonra qənimətləri, habelə Aişəni cariyə götürməyib. Əgər

onun döyüşdükləri adamlar kafir idilərsə nə üçün qənimət və cariyələri götürmədi? Yox əgər mömin idilərsə o zaman onlara qarşı nə üçün vuruşurdu? 3- cü də Sıffin döyüşündən sonra Müaviyə ilə razılaşmaya gələndə Əli öz adının yanında möminlərin əmiri sözünü yazmamışdı. Əgər o möminlərin əmiri deyilsə, deməli kafirlərin əmiridir. İbn Abbas cavabında deyir: 1 – ci Əli Allahın hökmünü qoyub insanlar vasitəsilə hökm vermişdir – sözünüzə gəlincə Uca Allah öz kitabında buyurur: **"Ey iman gətirənlər! İhramda ikən ovu öldürməyin. Sizlərdən kim onu qəsdən öldürərsə, (kəffarəsi) öldürdüyünə bənzər bir (qurbanlıq) heyvanı əvəz ödəməkdir. Buna sizlərdən iki ədalətli kişi hökm verməli, (sonra da həmin) qurbanlıq heyvan Kəbəyə çatdırılmalıdır."** Deməli Uca Allah Quranın gətirilməsini deyil iki nəfərin hökm verməsini tələb edir. Başqa bir ayədə buyurur: **"Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, onda kişinin ailəsindən bir hakim və qadının ailəsindən bir hakim göndərin."** Indi sizlərə sual verirəm, hansı birisi daha önəmlidir həcc vaxtı ov etmək, qadının məsələsi yoxsa möminlərin qanlarının axıdılmasının qarşısını almaq? Deyirlər doğrudur. 2- ci deyirsiniz ki, Əli Cəməl döyüşdən sonra qənimətləri, habelə qadınları o cümlədən Aişəni cariyə götürməyib. Heç ananız da cariyə götürülə bilərmi? Uca Allah buyurur ki: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır."** Əgər iddia etsəniz ki ananız deyil kafir olarsınız. Yox əgər desəniz ki, onu cariyə götürmək olar yenə kafir olarsınız çünki o möminlərin anası və peyğəmbərin xanımıdır. Deyirlər doğrudur. İbn Abbas deyir: 3- cü etirazınıza yəni Sıffin döyüşündən sonra Müaviyə ilə razılaşmaya gələndə Əlinin öz adının yanında möminlərin əmiri sözünü yazmamasına gəlincə isə Peyğəmbər müşriklərlə Hüdeybiyyə sülhü bağladığı zaman Allahın rəsulu Muhəmməd yazdırdığı zaman qureyşlilər buna etiraz edib deyirlər ki, yox Allahın rəsulu sözünü götür və Muhəmməd ibn Abdullah yaz. Çünki sənin peyğəmbər olduğunu qəbul etsəydik səninlə vuruşmazdıq. Peyğəmbər də həmin sözləri silmişdi. Onlar yenə doğrudur deyirlər və 2000 nəfər tövbə edərək Əlinin yanına qayıdır qayıdır. 6000 nəfər isə təəssübkeşlik edərək yenə öz rəylərində qalır. İbn Abbas qayıtdıqdan sonra onları vəsf edərək deyir ki, vallahi ki, çoxlu səcdə etməkdən onların alınlarının ortasında keçinin dizindəki izə bənzər bir iz var idi. Onlar

çoxlu Quran oxumaları məni çox təəccübləndirdi. Əli yenə də qan tökülməsinin tərəfdarı deyildi ta o vaxta dək ki, bir dəfə xavariclərdən bir neçəsi çayın yanına gəlib orada əməlisaleh bir kişinin quranı boynundan asıb əzbərədiyini görürlər. Həmin kişinin zövcəsi də hamilə vəziyyətdə onun yanında idi. Xavariclər ondan soruşurlar ki: sən kimsən? Deyir ki: Mən Xabbəb ibn əl-Əratın oğlu Abdullaham. Yəni peyğəmbərin sevimli səhabəsinin oğluyam. Həmin adamlar tutub həmin kişini hamilə zövcəsi ilə birlikdə əl-qolunu bağlayıb özləri ilə apararaq hər ikisini işgəncə verərək qətlə yetirirlər. Hətta rəvayət olunur ki onun hamilə xanımının bətnini belə yarırlar. Bu zaman Əli onlardan tələb edir ki, kim bu əməlisaleh insanı öldürübsə onu mənə təslim edin. Onlar da deyirlər ki bizim hamımız bunu etmişik. Bu zaman Əli böyük bir ordu yıxaraq onların üstünə hücum çəkir. Həmin döyüş Nəhruvan döyüşü adlanır. Həmin döyüşdə Əli ibn Əbu Talibin ordusu xavariclərin demək olar ki, hamısını məhv edirlər. Təxminən 16000 nəfər xavariclərdən qətlə yetirilir həmin döyüşdə. Lakin bununla da xavariclərin kökü kəsilmir. Bir müddət sonra onlar belə qərara gəlirlər ki, üç nəfər tağutu Əli ibn Əbu Talibi, Müaviyə ibn Əbu Sufyanı, bir də o zaman Misirin valisi olan Amr ibn Ası qətlə yetirib canlarını onlardan qurtarsınlar. Beləcə üç nəfər hazırlayirlar ki, eyni vaxtda Kufədə Əlini, Dəməşqdə Müaviyəni və Misirdə Amr ibn Ası qətlə yetirsinlər. Dəməşqdəkinə gəlincə o, Müaviyəni sübh namazına gedərkən vurmaq istədikdə qılıncın səsindən Müaviyə kənara çəkilərək onu öldürmüşdü. Bəzi rəvayətlərdə Müaviyənin yaralandığı bildirilir. Amr ibn Asa gəlincə o həmin gün xəstə olduğundan sübh namazına məscidə getməmişdi. Həmin xəvaric də onun əvəzində imam duran başqa birisini Amr hesab edərək qətlə yetirmişdi. Möminlərin əmiri Əli ibn Əbu Talibə gəlincə isə o Abdur-Rahmən ibn Mulcim adlı xavaric tərəfindən sübh namazında ikən vurularaq qətlə yetirilmişdi.

Sonradan hicrətin 46 –cı ilində onlar tamamilə azalırlar.

Uca Allahdan diləyim budur ki, bizləri batil əqidələrdən və onların ardıcıllarının şərindən, habelə fitnə və fitnə əhlindən qorusun.

# 8 – Allah yolunda cihad etmək.[1]

---

[1] Cihad sözü lüğəti mənada məşəqqət, çətinlik anlamındadır. Şəri mənada isə cihad kafirlərlə, yol kəsənlərlə və haqqa qarşı çıxanlarla vuruşmağa deyilir. Cihad həm Quran, həm sünnə, həm də icma ilə buyurulub. Cihadın hökmü fərdu kifəyədir. Yəni bir qisim müsəlman cihad edərsə kifayət edir. Üç halda isə cihad fərdu ayn hökmündə olur:

1- İki tayfa döyüş üçün qarşı-qarşıya gəldikdə oradakı hər kəsə vacib, geri dönmək isə haram olur.

2- Düşmən hər hansı bir ölkə və ya şəhərə hücum edərək oranı mühasirəyə aldıqda onlara qarşı müqavimət göstərmək vacib olur.

3- Müsəlman rəhbər ümumi səfərbərlik elan etdikdə cihad hər kəsə vacib olur. Uca Allah Tövbə surəsinin 38-ci ayəsində buyurur:"

**"Ey iman gətirənlər! Sizə nə olub ki, "Allah yolunda döyüşə çıxın!"– deyildikdə yerinizdə qaxılıb qalırsınız? Olmaya, axirətdən daha çox dünya həyatından razısınız? Halbuki dünya həyatının keçici zövqü axirətlə müqayisədə çox dəyərsiz bir şeydir."** Peyğəmbər də buyurur: "Döyüşə çağırıldığınız zaman gedin."

Cihad və onun fəziləti barədə ayə və hədislər olduqca çoxdur. Onlardan bəzilərini xatırladacağam:

Uca Allah Saf surəsinin 10-11-ci ayələrində buyurur:

**"Ey iman gətirənlər! Sizi ağrılı-acılı əzabdan xilas edəcək bir ticarəti sizə bildirimmi? Allaha və Onun Elçisinə iman gətirin, Allah yolunda malınız və canınızla cihad edin. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir."**

Həmçinin Uca Allah Tövbə surəsinin 111-ci ayəsində buyurur:

**"Doğrudan da, Allah möminlərdən, Cənnət müqabilində onların canlarını və mallarını satın almışdır. *Çünki* onlar Allah yolunda vuruşub öldürür və öldürülürlər. *Bu, Allahın* Tövratda, İncildə və Quranda Öz öhdəsinə götürdüyü bir vəddir."**

- Buxarinin Səhih əsərində Əbu Hureyradan rəvayət olunan hədisdə peyğəmbər demişdir: "Cənnətdə yüz təbəqə vardır. Həmin təbəqələri Allah mücahidlər üçün hazırlamışdır. Həmin təbəqələrdən biri ilə digəri arasındakı məsafə yerlə göy arasındakı məsafə qədərdir."

- Muslimin Səhih əsərində Əbu Musə əl-Əşaridən rəvayət olunan hədisdə peyğəmbər demişdir: "Cənnətin qapıları qılıncların kölgəsi altındadır."

- Muslimin Səhih əsərində Əbu Hureyradan rəvayət olunan hədisdə peyğəmbər demişdir: "Kim döyüşmədən və ya ən azı döyüşmək əzmində olmadan dünyasını dəyişərsə nifaqın bir şöbəsi üzərində ölmüş olar".

- Əbu Davudun Sünən əsərində səhih isnadla Ənəs bin Malikdən rəvayət olunan hədisdə peyğəmbər demişdir: "Müşriklərə qarşı canınızla, malınızla və dilinizlə cihad edin." Bu qəbildən olan hədislərə əsasən alimlər elm tələb etməyin də cihadın bir növü olduğunu bildirmişlər.

Cihadın tərk olunmasının nəticələri isə bunlardır:

1 - Həm dünyada həm də axirətdə müsəlmanların məhv olmalarına gətirib çıxarır.

2 - Zəlilliyini səbəblərindəndir. İbn Ömərdən rəvayət olunan hədisdə peyğəmbər demişdir:

"Əl-iynə ticarəti ilə alış-veriş edəcəyiniz zaman, inəklərin quyruqlarından yapışacağınız, əkinçilikdən razı qalacağınız və cihadı tərk edəcəyiniz zaman Allah sizi zəlilliyə düçar edəcək və siz öz dininizə qayıtmayanadək həmin zəlilliyi sizin üzərinizdən götürməyəcək." Hədisi Əbu Davud rəvayət etmiş və Şeyx Muhəmməd Nasirəddin əl-Albani onun səhih olduğunu bildirmişdir.

Qeyd: Əl-İynə ticarəti ona deyilir ki, birisinin pula ehtiyacı olur, lakin heç kəs ona borc vermir, o da gəlib hər hansı bir əmtəə məhsulunu sahibindən baha qiymətə nisyə alır, aldıqdan dərhal sonra həmin əmtəəni aldığından ucuz qiymətə nağd olaraq həmin şəxsə satır. Yəni bu ticarətdə məqsəd pul əldə etməkdir. Bu növ ticarətə əl-İynə ticarəti deyilir. Şafiilər bu ticarəti halal görürlər, digər üç məzhəb isə az öncə qeyd etdiyim hədisə əsasən bu növ ticarətin haram olduğunu bildirmişlər.

3 - Cihadın tərk olunmasının nəticələrindən üçüncüsü isə bəlalara səbəb olmasıdır.

1. Uca Allahın yolunda savaşmaq İslamın ən mühüm şüarlarından biri və onun zirvəsidir.

2. Cihadın dinimizdəki yeri bəllidir və qorunmaqdadır. Belə ki, ondan daha mühüm sayılan şeylər ondan önə çəkilə bilmədiyi kimi, ondan daha az əhəmiyyət kəsb edən şeylər də ondan önə çəkilə bilməz. Onu da bilmək gərəkdir ki, cihad Qiyamət gününədək davam edəcəkdir.

3 – Cihad iki qismə bölünür:

**Birinci:** Fərdu Kifayə hökmündə olan Fəth etmə və tələb cihadı.

Bunun üçün aşağıdakı şərtlərin mövcudluğu labüddür:

a) İmam ( Müsəlmanların rəhbəri).

b) Hakimiyyət və qüdrət (Bunun üçün İslam diyarının olması labüddür).

c) İslam bayrağı.

**İkinci:** Müdafiə cihadı. Bu növ cihad isə mənfur düşmənin qəfil hücumu zamanı hücuma məruz qalmış ölkənin əhalisi üçün Fərdul-ayn hökmünə olur. Bu zaman hücuma məruz qalanlar malik olduqları imkan və qüdrət çərçivəsində mübarizə aparmalıdırlar.

Əgər onlar düşmənin təcavüzü qarşısında tab gətirə bilməsələr, onlara yaxın olan ölkələrdəki müsəlman qardaşları Fərdu Kifayə hökmünün tələblərinə müvafiq olaraq yardım göstərməlidirlər.

4. Şərtdəki fəth və tələb cihadı üçün şəri tədarükün olması labüddür. Bu da iki növdür:

Birinci: Tərbiyə yəni iman tədarükü; Bu İslam ümmətinin elmi, əməli və etiqadi baxımdan Nöqsansız, Uca və Aləmlərin Rəbbi olan Allaha həqiqi qulluq etməsi, özlərini Uca Allahın kitabı ilə tərbiyələndirmələri, peyğəmbərinin sünnəsinə əsasən islah etmələri və Allahın dininə və şəriətinə yardım göstərmələri ilə olmalıdır. Uca Allah buyurur: **"Allah Ona yardım edənlərə, mütləq yardım edər."**[1]

İkinci: Maddi cəhətdən tədarük. Bu isə Allahın düşmənlərinə qarşı müqavimət göstərmək, habelə say və güc baxımından hazırlığın olmasıdır. Uca Allah Qurani Kərimdə buyurur: ***"Düşmənlərə*** **qarşı bacardığınız qədər qüvvə və döyüş atları hazırlayın ki, bununla Allahın düşmənini, öz düşməninizi və onlardan başqa sizin bilmədiyiniz, lakin Allahın bildiyi kimsələri qorxudasınız."**[2]

5. Şəriətə əsaslanaraq, qaydalarına müvafiq şəkildə cihad fərzini oyatmaq qəti şəkildə vacibdir. Ümmət, yəni rəhbərlər və onların rəiyyətləri bir-birindən ayrılmamalıdırlar. Bu oyanış isə lazımi şəkildə həyata keçirilməlidir.

---

[1] əl-Həcc, 40.
[2] əl-Ənfal, 60.

Şərtlərinə müvafiq olan bu mübarək fərzin dirçəlişinə “Terror“ adı vermək zəif bir məğlubiyyət və tam bir cahillikdən başqa bir şey deyildir.

Lakin cihad və din adı altında emosialara uymaq və xaus yaratmaq, əmin-amanlıqda olanları qorxutmaq, körpələri, qadınları və ahılları qətlə yetirmək, ümməti öz əmin- amanlığından məhrum etmək isə Allaha, onun Rəsuluna və möminlərə qarşı çıxmaq və elm əhlinin yolundan kənarlaşmaqdan başqa bir şey deyil.



# Son söz.

## Allah bizlərə Cənnəti və Ona nəzər salmağı nəsib etsin.

Bu, müxtəsər olaraq İzzət və Cəlal Sahibi olan Allahın Sələf mənhəcinin və Sünnə əhlinin yolunun işığı altında bizlərə qələmə almağa və araşdırmağa müvəffəq etdiyi məsələlərin sonudur.

Uca Allahdan həm bizə, həm də bütün qardaşlarımıza müvəffəqiyyət diləyir, Allahdan bizə yaxşı işlər görməyi müvəffəq etməsini, Öz övliyalarını izzətləndirməsini, düşmənlərini alçaltmasını, bidət və zəlalət əhli üzərində üstün etməsini, yazdıqlarımızın düzgün olmasını, habelə etiqadda, dildə və əməldə ixlas bəxş etməsini diləyirik.

Onu da qeyd edək ki, qəlbimiz Allah üçün dəlil və açıqlamalarla nəsihət edən hər kəs üçün açıqdır. Uca Allah buyurduğu kimi: "**Mən ancaq bacardığım qədər islah etmək istəyirəm. Mən ancaq Allahın sayəsində uğur qazanıram. Mən yalnız Ona təvəkkül edir və yalnız Ona üz tuturam.**"[1]

Muhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun.

Son duamız aləmlərin Rəbbi olan Allaha həmd olsundur.

---

[1] Hud, 80.

# Mündəricat: